AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ
1921

QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Fevral
2019
№ 02 (1099)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Akademik Həmid Araslının 110 illiyinin qeyd edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2019-cu ilin fevral ayında görkəmli ədəbiyyatşünas, Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü, Əməkdar elm xadimi, filologiya elmləri doktoru, professor Həmid Məhəmmədtağı oğlu Araslının anadan olmasının 110 illiyi tamam olur.

Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı sahəsində xüsusi mövqeyə malik nüfuzlu mütəxəssis və dərin erudisiyalı alim kimi geniş şöhrət qazanan akademik Həmid Araslı çoxsaylı araşdırmaları ilə respublikada ədəbiyyatşünaslığın inkişafına dəyərli töhfələr vermişdir. Azərbaycan ədəbiyyatı tarixinin sistemləşdirilməsi və dolğun mənzərəsinin yaradılması onun mühüm elmi nailiyyətlərindəndir. Həmid Araslı folklorumuzun tədqiqini həmişə diqqət mərkəzində saxlamış, "Kitabi-Dədə Qorqud" abidəsinin müxtəlif nəşrlərinin gerçəkləşdirilməsinə, dahi Nizami, Nəsimi və Füzuli irsinin öyrənilməsinə böyük əmək sərf etmiş, anadilli ədəbiyyatın tanınmış nümayəndələrinin əsərlərinin şərqşünaslığın nailiyyətləri əsasında əhatəli şərhlərlə mükəmməl elmi-tənqidi mətnini hazırlamışdır. Məhsuldar elmi yaradıcılığını pedaqoji fəaliyyətlə uzun illər boyu uğurlu şəkildə əlaqələndirən alim, eyni zamanda, ölkənin mədəni-ictimai həyatında yaxından iştirak etmişdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, ədəbi-bədii fikir tariximizin tədqiqi, təbliği və yüksəkixtisaslı kadrların hazırlanması işində təqdirəlayiq xidmətlərini nəzərə alaraq akademik Həmid Araslının anadan olmasının 110-cu ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə **qərara alıram.**

1. Azərbaycan Milli Elmlər Akademiyası Azərbaycan Respublikasının Təhsil Nazirliyi ilə birlikdə akademik Həmid Araslının 110 illiyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 11 fevral 2019-cu il*

## 2 Fevral - Azərbaycan Gəncləri Günü münasibətilə görüş

**Fevralın 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov 2 Fevral-Azərbaycan Gəncləri Günü münasibətilə universitetin bir qrup fəal tələbəsi ilə görüşüb.**



Görüşdə Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektor Əbdül Xalıqov, rektor köməkçisi Riyad Rüstəmli, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin baş mütəxəssisi Sahil Qələndərov, Tələbə Gənclər Təşkilatının sədri Taleh Budaqov iştirak ediblər.

Rektor Cəfər Cəfərov tələbələri 2 Fevral-Gənclər Günü münasibətilə təbrik edib, onlara möhkəm cansağlığı, uzun ömür, həyatda və təhsildə uğurlar arzulayıb.Rektor qeyd edib ki, ölkəmizdə əsası ulu öndərimiz Heydər Əliyev tərəfindən qoyulmuş dövlət gənclər siyasətini Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir. Dünyada 200 dövlət, 5 minə yaxın xalq var. Gənclər hər bir ölkənin, dövlətin gələcəyidir. Xüsusən də, müəllim peşəsini seçən gənclərin üzərinə böyük məsuliyyət düşür. Sizin gələcəkdə bilikli, bacarıqlı mütəxəssislər kimi fəaliyyət göstərməyiniz xalqımızın, dövlətimizin daha da güclənməsində mühüm rol oynayacaq. Siz Azərbaycan məktəbini yeni bir keyfiyyət mərhələsinə gətirməlisiniz. Gənclər müstəqil dövlətimizin qədrini bilməli, onu göz-bəbəyi kimi qorumalıdırlar.

Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev çıxış edərək bildirib ki, bu görüşdə universitetin xüsusi nailiyyətləri ilə seçilən tələbələri iştirak edirlər. Bu gənclər öz müsbət fəaliyyətləri ilə özlərini təsdiq ediblər. Professor F.Rzayev gəncləri təbrik edərək onlara yeni-yeni uğurlar arzulayıb.

Görüşdə 2018-ci ildə təhsildə və ictimai fəaliyyətdə fərqləndiyinə görə 2 Fevral-Azərbaycan Gəncləri Günü münasibətilə "İlin gənci" nominasiyası üzrə Aytən Bağırova, tələbələrin vətənpərvərlik hissinin yüksəldilməsi istiqamətində göstərdiyi fəaliyyətə görə "İlin gənci" nominasiyası üzrə Taleh Mirzəyev, mədəniyyət sahəsində fərqləndiyinə görə "İlin gənci" nominasiyası üzrə Məxfirət Hüseynova, idman sahəsində fərqləndiyinə görə "İlin gənci" nominasiyası üzrə Rəvan Fərzaliyev, əcnəbi tələbələrin universitetin ictimai həyatında fəal iştirakı ilə bağlı apardığı məqsədyönlü işlərə görə "İlin gənci" nominasiyası üzrə Hakan Köse, tələbələr arasında ictimai fəaliyyətdə xüsusi fərqlənliklərinə görə "İlin gənci" nominasiyası üzrə Flora Kərimli, Sona Həsənova fəxri fərmanla, tələbələr arasında ictimai fəaliyyətdə fərqləndiklərinə görə Sənan İmanov, Məhbubə Axundova, Nuranə Balakişiyeva, Şəlalə Zəkizadə, Mehriban Piriyeva, Lamiyə Adıgözəlova, Aysel Ramazanova, Məsməxanım Qədimova, Səriyyə Mehdizadə, Vüqar Suvarov təşəkkürnamə ilə təltif ediliblər.

Tələbə-gənclər onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edərək yüksək səviyyəli mütəxəssis və əsl vətəndaş kimi yetişmək üçün əzmlə çalışacaqlarını bildiriblər.

Sonda xatirə şəkli çəkdirilib.

**Mənsur İbrahimli**

## Professor Knyaz Mirzəyevlə görüş

**Fevralın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Abay adına Qazaxıstan Milli Pedaqoji Universitetinin Şərq dilləri və tərcümə kafedrasının müdiri, professor Knyaz Mirzəyevlə görüşüb.**



Görüşdə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Filologiya fakültəsinin dekan müavini, dosent Məhərrəm Hüseynov iştirak ediblər.

Rektor Cəfər Cəfərov görüş zamanı ADPU haqqında məlumat verərək bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu ADPU-ya qoşulub. ADPU-nun bölgələrdə 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. ADPU-da 18 minə yaxın tələbə təhsil alır. Universitet öz nüfuzunun artırılması, təhsilin keyfiyyətinin yüksəldilməsi, beynəlxalq əlaqələrinin genişləndirilməsi və xarici layihələrdə fəal iştirak etmək üçün məqsədyönlü fəaliyyət göstərir. Son illər Azərbaycanda müəllim peşəsinə maraq güclənib. Yüksək bilik səviyyələri ilə fərqlənən və müəllimlik peşəsini seçən gənclərin sayı xeyli artıb. Bu faktı dövlət başçımız cənab İlham Əliyev öz çıxışında xüsusi vurğulayıb. Universitet 2021-ci ildə 100 illik yubileyini layiqincə qeyd edəcəkdir. ADPU Qazaxıstan universitetləri, o cümlədən Abay adına Qazaxıstan Milli Pedaqoji Universiteti ilə əlaqələrini genişləndirmək niyyətindədir.

Professor Knyaz Mirzəyev səmimi və mehriban görüşə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, təmsil etdiyi universitetin professor-müəllim və tələbə heyəti, tədris prosesi, beynəlxalq əlaqələri barədə məlumat verib.

Görüşdə ikitərəfli əməkdaşlıq əlaqələri müzakirə edilib və bu əlaqələrin genişləndirilməsinin vacibliyi vurğulanıb.

**Orxan Abdullayev**

# Təcrübə Komissiyasının geniş tərkibdə iclası

Fevralın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Təcrübə Komissiyasının geniş tərkibdə iclası keçirilib. İclasda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, direktor müavini, dosent Ənvər İmanov, Təcrübə rəhbəri Qəmər Qəribova, Təcrübə Komissiyasının üzvləri, metodika, pedaqogika və psixologiya kafedralarının müdirləri, fakültə üzrə tərcübə rəhbərləri, ixtisaslar üzrə metodistlər, pedaqoqlar, psixoloqlar iştirak ediblər. İclasda pedaqoji təcrübə rəhbərlərinə metodiki təlimat və tövsiyələrin verilməsi məsələsi müzakirə edilib.

İclası giriş sözü ilə açan Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev bildirib ki, pedaqoji təcrübə tələbələrin həyatında mühüm mərhələdir. Tələbələr tədris prosesi zamanı əldə etdikləri bilik və bacarıqları pedaqoji təcrübədə sınaqdan keçirirlər. Pedaqoji təcrübə tələbə-gənclərin müəllim kimi formalaşmasına səmərəli təsir edir. Çıxışında ADPU-da 2018-2019-cu tədris ilinin yaz semestrində əyani və qiyabi təhsilalma formaları üzrə keçiriləcək pedaqoji təcrübə ilə bağlı görülmüş işlərdən danışan dosent S.Əliyev qeyd edib ki, cari tədris ilinin ilk semestrində fakültə və kafedra müdirləri, filial direktorları ilə təcrübə keçəcək tələbələrin və məktəblərin siyahısı dəqiqləşdirilib. Fevralın 18-də təcrübə başlayır. Bu il ADPU-nun 3822 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. Onlardan 2463 nəfər ali təhsilin bakalavriat səviyyəsində təhsil alan tələbələrdir. Ali təhsilin magistratura səviyyəsində 397 nəfər elmi-pedaqoji təcrübə keçəcək. ADPU-nun filiallarının 799 nəfər tələbəsi, Davamlı təhsil və təlim şöbəsinin 163 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin tələbələri pedaqoji təcrübənin ikinci mərhələsinə başlayırlar. ADPK-də pedaqoji təcrübə 20 həftə müddətində, II mərhələdə keçirilir, birinci hissəsi keçirilib. Pedaqoji təcrübənin keçirilməsi ilə bağlı Təhsil Nazirliyi, Bakı Şəhəri üzrə Təhsil İdarəsi, Bakı Şəhər İcra Hakimiyyəti, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi və bəzi özəl müəssələrlə razılıq əldə edilib, üçtərəfli müqavilələr hazırlanıb. Bir neçə ikitərəfli müqavilələrin tərtibi ilə əlaqədar işlər başa çatdırılıb. Universitetimizin tələbələri Təhsil Nazirliyinin 7 tam orta məktəbində, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin 79 tam orta məktəbində, Bakı Şəhər İcra Hakimiyyətinin 10 uşaq bağçasında, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin 10 müəssisəsində və 2 özəl müəssisədə təcrübə keçəcəklər.






Tədris Departamentinin direktor müavini, dosent Ənvər İmanov ”Pedaqoji təcrübə gündəliyinin tərtibinə dair tövsiyələr” adlı metodik vəsait haqqında məlumat verib. Qeyd edib ki, Ümumi pedaqogika kafedrasında hazırlanmış bu vəsait pedaqoji təcrübə zamanı gündəlik tərtib etmək üçün təcrübəçi tələbələrə metodik kömək göstərmək məqsədilə hazırlanıb. Tələbələrin pedaqoji təcrübədə olduqları məktəbdə təlim və tədris fəaliyyətinə nəzarət, əldə edilən nəticələrin qeydiyyatının aparılmasına dair sənəd təcrübəçi tələbələrin fəaliyyətinin pedaqoji təcrübə rəhbəri, təcrübə başa çatdıqdan sonra isə universitet rəhbərliyi tərəfindən qiymətləndirilməsi üçün əsas sənəddir. Vəsait həm də 14 həftəlik (70 gün) pedaqoji təcrübə müddətində təcrübəçi tələbənin yazdığı fərdi planında nəzərdə tutulan işlərin yerinə yetirilməsində başlıca sənəddir. Pedaqoji təcrübə rəhbərləri fəaliyyətlərini bu sənədin tələblərinə əsasən qurmalıdırlar.

Təcrübə rəhbəri Qəmər Qəribova, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva , Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti Fəxrəddin Yusifov çıxış edərək pedaqoji təcrübənin tələbələrin əldə etdikləri bilik və bacarıqların aşkara çıxarılmasında mühüm rol oynadığını bildiriblər və tələbələrə uğurlar arzulayıblar.

**Könül Nəzərova**

# Pedaqoji təcrübənin başlanmasına həsr olunmuş konfranslar



Fevralın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya, Fizika və texnologiya, Kimya və biologiya, Riyaziyyat və informatika, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim, Tarix və coğrafiya, İbtidai təhsil, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültələrində və SABAH qruplarında 2018-2019-cu tədris ilinin yaz semestrində əyani və qiyabi təhsilalma forması üzrə keçiriləcək pedaqoji təcrübəyə həsr olunmuş konfranslar keçirilib. Konfranslarda fakültə dekanları, kafedra müdirləri, Təcrübə rəhbəri Qəmər Qəribova, Təcrübə Komissiyanın üzvləri, pedaqoji təcrübə rəhbərləri, təcrübə keçəcək tələbələr iştirak ediblər. Filologiya fakültəsində keçirilən konfransda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov iştirak ediblər.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova, Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov, Kimya və biologiya fakültəsinin Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının müdiri Reyhan Ağayeva, Riyaziyyat və informatika fakültəsinin dekan müavini, dosent Allahverdi Cəfərov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəlsinin dekanı, dosent Laçın Həsənova və SABAH qruplarının koordinator rəhbəri Lalə Mürsəlbəyova çıxış edərək pedaqoji təcrübə haqqında tələbələrə ətraflı məlumat verərək təcrübə müddətində universiteti layiqincə təmsil etməyi tövsiyə ediblər və onlara uğurlar arzulayıblar. Qeyd edək ki, Fizika və texnologiya fakültəsində pedaqoji təcrübənin başlanmasına həsr olunmuş konfransda Bakı Avropa Liseyinin direktoru, beynəlxalq təhsil eksperti, psixologiya üzrə fəlsəfə doktoru Zülfiyyə Veyisova iştirak edib.

Konfranslarda qeyd edilib ki, pedaqoji təcrübə tələbələrin həyatında mühüm və məsuliyyətli mərhələdir. Pedaqoji təcrübə tələbələrin müəllimliyə doğru atdıqları vacib addımdır. Pedaqoji təcrübə tələbəgənclərin müəllim kimi formalaşmasında əhəmiyyətli rol oynayır.

Məlumat üçün bildirək ki, bu il ADPU-nun 3822 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. Onlardan 2463 nəfər ali təhsilin bakalavriat səviyyəsində təhsil alan tələbələrdir. Ali təhsilin magistratura səviyyəsində 397 nəfər elmi-pedaqoji təcrübə keçəcək. ADPU-nun filiallarının 799 nəfər tələbəsi, Davamlı təhsil və təlim şöbəsinin 163 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin tələbələri pedaqoji təcrübənin ikinci mərhələsinə başlayırlar. Belə ki, ADPK-də pedaqoji təcrübə 20 həftə müddətində, iki mərhələdə keçirilir, birinci hissəsi keçirilib. Pedaqoji təcrübənin keçirilməsi ilə bağlı Təhsil Nazirliyi, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, Bakı Şəhəri üzrə Təhsil İdarəsi, Bakı Şəhər İcra Hakimiyyəti və bəzi özəl müəssisələrlə razılıq əldə edilib. Universitetin tələbələri Təhsil Nazirliyinin 7 tam orta məktəbində, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin 10 müəssisəsində, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin 79 tam orta məktəbində, Bakı Şəhər İcra Hakimiyyətinin 10 uşaq bağçasında və 2 özəl müəssisədə təcrübə keçəcəklər. Təcrübə 14 həftə (70 gün) davam edəcək.



Konfranslarda təcrübə keçəcək tələbələri maraqlandıran suallar cavablandırılıb, onların fikir və təklifləri dinlənilib.

**Mahirə Məhərrəmqızı**

# ADPU-nun əməkdaşları EQAC layihəsi çərçivəsində Londonda səfərdə olublar

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) əməkdaşları Avropa Komissiyasının maliyyə dəstəyi ilə həyata keçirilən "Azərbaycan universitetlərində Keyfiyyətin Təminatı Mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi" layihəsi çərçivəsində 9-16 fevral tarixlərində Böyük Britaniya və Şimali İrlandiya Birləşmiş Krallığının paytaxtı London şəhərində yerləşən Middlesex Universitetinə təlim səfərində olublar. Bakı Biznes Universitetinin koordinatorluğu ilə həyata keçirilən sözügedən layihədə ADPU da daxil olmaqla 11 yerli və 5 avropalı tərəfdaş müəssisə iştirak edir. Təlim səfərində ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi, layihənin universitet üzrə meneceri Lətif Kəngərlinski, Tədqiqat və inkişaf şöbəsinin mütəxəssisi Xəyyam Cəfərzadə iştirak ediblər.




Bütün təlimlər London şəhərində yerləşən Middlesex Universitetində həyata keçrilmişdir. Səfər zamanı keyfiyyətin təminatı ilə bağlı bir sıra təqdimat və müzakirələrdən ibarət olan, zəngin proqramı əhatə edən təlim və seminarlar keçirilmişdir. Ümumilikdə təlim zamanı əsas mövzular Milli Kvalifikasiya Çərçivəsi, təlim nəticələri, bacarıqlar və təhsildə keyfiyyətlə bağlı bir sıra digər mövzulardan ibarət olub.

Təlimlər zamanı təhsilin keyfiyyətinun təminatında maraqlı tərəflərin təhlilinin aparılması, əhatəsinin müəyyən edilməsinin əhəmiyyəti ilə bağlı "Maraqlı tərəflərin müəyyən edilməsi (mapping) və cəlb edilməsi" mövzusunda, keyfiyyətin əsas aspektlərinin ümumi izahına həsr olunmuş "Keyfiyyətə baxış" mövzusunda, kursun çatdırılma və dizaynı ilə bağlı "Akademik inkişaf, qiymətləndirmə və təhlil", eləcə də "Milli keyfiyyət çərçivəsi" mövzusunda, öyrənmə nəticələri ilə səriştə arasındakı qruplaşmağa-uyğunlaşmağa fokuslanmaqla bağlı "Səriştə və öyrənmə nəticələrinin birləşməsi", "Qiymətləndirmə təcrübələrinin nümayişi", "İllik monitorinq", "Keyfiyyətin təminatının akademik departamentlərə təsiri" və s. mövzularda təqdimatlar nümayiş olunub, müzakirələr aparılıb.

Qeyd etmək lazımdır ki, layihənin əsas məqsədi Azərbaycan ali təhsil müəssisələrində keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və onların iş prinsipinin beynəlxalq standartlara uyğunlaşdırılmasından ibarətdir. Layihə çərçivəsində ötən müddətdə xarici mütəxəssislərin iştirakı ilə bir sıra təlimlər keçirilib, o cümlədən 3 xarici səfər baş tutub.

Təlimlərin sonunda Azərbaycan Respublikasının Londondakı səfirliyinin əməkdaşının, Middlesex Universitetinin prorektorunun və proqram rəhbərinin iştirakı ilə bütün əməkdaşlara sertifikatlar təqdim edilib.

# "Elm günü" ilə bağlı seminar

Azərbaycan Respublikası Prezidentinin "Elm günü"nün təsis edilməsi haqqında Sərəncamının icrası ilə əlaqədar olaraq fevralın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) professor-müəllim heyəti üçün "Beynəlxalq elmi jurnallarda məqalələrin yazılması texnologiyaları" mövzusunda "Clarivate Analytics" Şirkətinin Rusiya bölməsinin elmi informasiya resursları üzrə eksperti, filologiya üzrə fəlsəfə doktoru Valeriya Kurmakayevanın iştirakı ilə seminar keçirilib.



Seminarı giriş sözü ilə ADPU-nun Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev açaraq məruzəçi ekspert Valeriya Kurmakayevanı ADPU-nun rektoru, professor Cəfər Cəfərovun və tədbir iştirakçılarının adından salamlayaraq, şirkətlə universitet arasında yaradılan əməkdaşlığın əhəmiyyətindən danışaraq, bu əlaqələrdən məmnunluğunu ifadə edib. O bildirib ki, təhsilə dövlət səviyyəsində göstərilən diqqət və qayğı sayəsində artıq Pedaqoji Universitetdə keyfiyyətli tədrislə yanaşı, mükəmməl elmi-tədqiqat işləri də aparılır. ADPU-nun hədəflərindən biri də Azərbaycan Respublikası Nazirlər Kabinetinin 29 dekabr 2017-ci il tarixli 610 nömrəli qərarı ilə təsdiq olunmuş "Ali təhsil müəssisələrinə "Tədqiqat universiteti" statusu verilməsi üçün tələblər"ə cavab verən universitet modelinə keçidə nail olmaqdır.

Bunun üçün doktorantura səviyyəsində kadr hazırlığı aparılan zaman əsas diqqətin "Web of Science", "SCOPUS" kimi beynəlxalq elmmetrik bazalara daxil olan jurnallarda məqalələrin çap olunmasına şərait yaradılması vacib amil olaraq önə çəkilib. Buna görə də son üç ildə ADPU alimlərinin impakt-faktor göstəricili jurnallarda çap olunan məqalələrinin sayı 4,5 dəfə artıb. Həmçinin Y.Alıyev qeyd edib ki, ADPU-da professor-müəllim heyəti, kafedralar və fakültələr arasında "Reytinq qiymətləndirilməsi"nin tətbiq edilməsi ilə yaranmış rəqabət mühiti sayəsində əsaslı müsbət dönüş yaranıb. Artıq əməkdaşlarımız arasında "Thomson Reuters" Agentliyinin siyahısına düşən beynəlxalq elmi jurnallarda məqalələr çap etdirməyə daha böyük tələbat yarandığından "Clarivate Analitics" Şirkətinin imkanlarından istifadə etməyi ən doğru seçim kimi önə çəkmişik. Pedaqoji Universitetin Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanovun təşəbbüsü ilə "Clarivate Analytics" Şirkətinin Azərbaycan üzrə nümayəndəliyi ilə mütamadi olaraq görüşlər təşkil olunur. "Elm günü" ilə bağlı həyata keçirilən tədbirlərdən biri də professor-müəllim heyətinə, magistr və doktorantlara "Web of Science" platformasına daxil olaraq yüksək indeksli beynəlxalq jurnallarda məqalələrə qoyulan tələblər, seçim meyarları və digər praktiki məsələlərlə bağlı məlumatlar vermək üçün "Clarivate Analytics" Şirkətinin eksperti Valeriya Kurmakayevanın seminarının təşkil edilməsidir. Əminik ki, bu seminardan sonra universitetimizin professor-müəllim heyəti, doktorantları elmi-tədqiqat işlərinin nəticələrini asanlıqla daha nüfuzlu elmi jurnallarda çap etdirəcəklər.

Sonra "Clarivate Analytics" Şirkətinin eksperti Valeriya Kurmakayeva universitetin professor-müəllim heyəti üçün "Beynəlxalq elmi jurnallarda məqalələrin yazılması texnologiyaları" mövzusunda seminara başlayıb. O, seminar iştirakçılarına "Web of Science" platformasına daxil olmaq, platformada axtarışın səmərəli aparılması, yüksək indeksli beynəlxalq jurnallarda məqalələr üçün qoyulan tələblər, seçim meyarları və digər praktiki məsələlərlə bağlı məlumatlar verərək bildirib ki, bu gün alimlər, mütəxəssislər apardıqları tədqiqat işlərinin nəticələrinə uyğun olaraq yazdıqları məqalələrin çap etdirilməsi zamanı işbazların toruna düşürlər. Nəticədə uzun müddət əziyyət çəkirlər, yazdıqları tədqiqat işləri mötəbərliyini itirir, həmçinin də müəlliflər böyük miqdarda maliyyə itkiləri ilə üzləşirlər.

V.Kurmakayeva fırıldaqçıların və işbazların toruna düşməmək üçün əsas diqqət yetiriləcək bir çox məqamlara toxunub. Həmçinin ekspert nüfuzlu elmi jurnallara məqalə yazılan zaman diqqət ediləcək bir çox parametrlərə diqqət edilməsinə dair izahatlar verib.

Seminarın sonunda ekspert universitetin professor-müəllim heyətinin mövzu ilə bağlı suallarını cavablandırıb.

# 21 Fevral - Beynəlxalq Ana Dili Günü münasibətilə "Dilimiz varlığımızdır"adlı tədbir

Fevralın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatının Filologiya fakültəsinin Gənclər Birliyinin təşəbbüsü və təşkilatçılığı ilə Beynəlxalq Ana Dili Günü münasibətilə "Dilimiz varlığımızdır" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədris Departamentinin direktor müavini, dosent Ənvər İmanov, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Tələbə Həmkarlar İttifaqı Komitəsini sədri, dosent Vurğun Məmmədov, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev, Filologiya fakültəsinin professor-müəllim heyəti, kafedra müdirləri, fakültə dekanları, Azərbaycan Milli Elmlər Akademiyasının təmsilçiləri, tanınmış və nüfuzlu alim-mütəxəssislər, tələbələr iştirak ediblər.




Tədbiri giriş sözü ilə Filologiya fakültəsinin dekanı, filologiya üzrə elmlər doktoru, professor Mahirə Hüseynova açaraq qonaqları, professor-müəllim heyətini, tələbələri salamlayıb və 21 Fevral-Beynəlxalq Ana Dili Gününün əhəmiyyətindən, ədəbi dil normalarının qorunması uğrunda mübarizədən danışıb. Bildirib ki, Beynəlxalq Ana Dili Günü bütün dünyada iyirminci dəfədir qeyd olunur. Belə ki, 1999-cu ilin noyabr ayında Birləşmiş Millətlər Təşkilatı (BMT) Banqladeş səfirinin təşəbbüsü ilə fevral ayının 21-ni Beynəlxalq Ana Dili Günü elan edib. Lakin bu günün elan olunması 1999-cu ilə təsadüf etsə də, yaranma səbəbinin baş verdiyi hadisələr daha əvvəlki dövrə gedib çıxır. Belə ki, 1952-ci il fevralın 21-22-də Pakistanda benqal dilinin qadağan edilməsinə etiraz əlaməti olaraq keçirilmiş aksiyada polis və silahlı qüvvələrin müdaxiləsi nəticəsində 4 nəfər tələbə şəhid olub. Bununla əlaqədar olaraq, Banqladeş nümayəndələri həmin şəhidlərin xatirəsinə hörmət əlaməti kimi fevralın 21-nin Ana Dili Günü adlandırılması haqqında müraciət ediblər. Nəticədə UNESCO-nun Baş Konfransında 21 Fevral - Beynəlxalq Ana Dili Günü elan olunub və üzv ölkələrə bildirilib ki, həmin gün məktəblərdə, universitetlərdə ana dilinin əhəmiyyəti ilə bağlı tədbirlər, konfranslar, seminarlar keçirilsin.

Bütün dünya dövlətlərində olduğu kimi, respublikamızda da bu gün qeyd olunur. Sevindirici haldır ki, dilimizə qayğı göstərmək, onu qorumaq, təbliğ etmək kimi məsələlər ölkəmizdə təkcə bu gün aktuallaşdırılmır, müntəzəm olaraq həyata keçirilir. Xüsusi qeyd etmək lazımdır ki, ulu öndər Heydər Əliyev ardıcıl və məqsədyönlü dil siyasəti aparıb, Azərbaycan dilinin qorunub saxlanılmasında misilsiz xidmətlər göstərib. Azərbaycan dövləti ana dilimizin qorunması, inkişaf etdirilməsi, öyrənilməsi sahəsində mühüm addımlar atır. Ötən müddət ərzində ölkə rəhbərliyi tərəfindən Azərbaycan dili ilə bağlı qəbul olunmuş Dövlət Proqramı, fərman və sərəncamlar bunun ən gözəl nümunələri sayıla bilər. Müasir dövrdə ardıcıl şəkildə Azərbaycan dili ilə bağlı mühüm işlər görülür, konfranslar keçirilir, tədqiqatlar aparılır. Professor M.Hüseynova qeyd edib ki, dilimizi qorumaqla zəngin tariximizi, milli mənliyimizi, kimliyimizi, mənəviyyatımızı qorumuş oluruq.

YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatının Filologiya fakültəsinin Gənclər Birliyinin adından çıxış edən Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müəllimi İlkin Əsgərov Azərbaycan dilinin saflığı və onun qorunması məsələsindən danışıb, dövlətin uğurlu dil siyasəti apardığını vurğulayıb. İ.Əsgərov çıxışında Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 1 noyabr 2018-ci il tarixli "Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında" Fərmanının dilimiz üçün əhəmiyyətindən danışıb.

Sonra Mirzə Ələkbər Sabir Fondunun prezidenti Sevda Tahirli Azərbaycan dilinin incəliklərindən, onun zəngin ifadə çalarlarından, potensial imkanlarından söz açıb. Mövzu ilə əlaqədar slaydlar nümayiş olunub.

Çıxışlardan sonra tədbir tələbəgənclərin hazırladıqları musiqi nömrələri, rəqslər, səsləndirdikləri şeirlərlə davam edib. Bədii-musiqili hissə tədbir iştirakçılarında yüksək əhval-ruhiyyə yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.



**Günay Bağırlı**

# Tarix və coğrafiya fakültəsində türkiyəli alimlərlə görüş

Fevralın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 2 nömrəli tədris binasında Tarix və coğrafiya fakültəsi tərəfindən Ankara Universitetinin Sosial iş bölümünün başqanı, professor Veli Duyanın və başqan yardımçısı Melahet Demirbilekin fakültədə professor-müəllim və tələbə heyəti ilə görüşü təşkil edilib. Görüşdə Tarix və coğrafiya fakültəsinin professor-müəllim heyəti, ADPU-nun digər fakültə və şöbələrinin əməkdaşları və eləcə də "Sosial iş" ixtisası üzrə təhsil alan tələbələr iştirak ediblər. Tədbirdə professor Melahet Demirbilekin "Türkiyede sosiyal hizmet eğitimi ve uygulamaları" mövzusunda məruzəsi dinlənilib.



Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov görüşü açıq elan edərək, tədbir haqqında məlumat verib və görüşün aktuallığını qeyd edib. Tədbirin davamında dosent Şahin Pənahov sözü Fəlsəfə və sosial fənlər kafedrasının dosenti Əhməd Qəşəmoğluna verib. Dosent Əhməd Qəşəmoğlu çıxış edərək ölkədə islahatların getdiyi bir zamanda sosial sahədə də böyük dəyişikliklərə ehtiyac olduğunu qeyd edib və bu sahədə ADPU-da qazanılmış təcrübəni diqqətə çatdırıb.

Görüşdə Ankara Universitetinin və ADPU-nun bu sahədə əməkdaşlıq perspektivləri haqqında geniş söhbətlər aparılaraq rəsmi qərarın qəbul edilməsinin məqsədəuyğunluğu qeyd edilib. Eyni zamanda çıxışlarda sosial işin bütün insan qruplarına və fərdlərə, ümumiyyətlə, cəmiyyətin bütün təbəqələrinə aid olduğu vurğulanaraq bu istiqamətdə təcrübəli mütəxəssislərin yetişdirilməsinin vacibliyi bildirilib.

Görüşdə mövzu ilə bağlı geniş müzakirələr aparılıb, professor-müəllim heyətini maraqlandıran suallar cavablandırılıb və fikir mübadiləsi aparılıb. Eyni zamanda görüşdə fəallıq göstərən "Sosial iş" ixtisasının bir sıra tələbələri distant təhsil, tələbə mübadiləsi və təcrübə proqramları ilə bağlı suallar verərək bu sahədə universitetlərarası əməkdaşlığın yaradılması və tələbələrin bu proqramlara cəlb edilməsinə köməklik göstərilməsini xahiş ediblər.

Sonra qonaqların ADPU-nun 2 nömrəli tədris binasında yerləşən Heydər Əliyev Mərkəzinə ziyarəti təşkil edilib. Heydər Əliyev Mərkəzinin baş mütəxəssisi Aytən Daşdəmirova Mərkəzin fəaliyyəti barədə qonaqlara ətraflı məlumat verib.

Tədbirin sonunda xatirə şəkilləri çəkdirilib.

# ADPU-da Xocalı soyqırımı qurbanlarının xatirəsi anılıb

**Fevralın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsil alan Türk Tələbələrin İdarə Heyətinin təşəbbüsü ilə Xocalı soyqırımının iyirmi yeddinci ildönümünə həsr olunmuş anım mərasimi keçirilib. Anım mərasimindən öncə universitetdə qanvermə aksiyası keçirilib, sonra isə tədbir Böyük Akt zalında davam etdirilib. Rəsmi və bədii hissədən ibarət olan tədbirdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər.**

Tədbirdə ilk olaraq Xocalıda həlak olmuş soydaşlarımızın və Vətən uğrunda mübarizədə canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Azərbaycanın və Türkiyənin dövlət himnləri səsləndirilib.

Anım mərasimini giriş sözü ilə açan Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov universitetin rəhbərliyi adından tədbirin təşkilatçılarına təşəkkür edib. Prorektor E.Aslanov qeyd edib ki, Xocalı soyqırımı yalnız Azərbaycan xalqına qarşı deyil, bütün bəşəriyyətə qarşı törədilmiş ağır hərbi cinayətdir. Hər il fevral ayında həm Azərbaycanda, həm də dünyanın bir çox ölkələrində Xocalı soyqırımına həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Məqsəd dünya ictimaiyyətinin diqqətini yenidən Xocalı faciəsinə yönəltməkdir. Ermənilər öz havadarlarının köməyi ilə Xocalı soyqırımını törətməklə xalqımızı müstəqillik uğrunda mübarizədən yayındırmaq, onun azadlıq ruhunu məhv etmək istəyirdilər. Lakin xalqımız bu faciədən əyilmədi, sınmadı, sarsılmadı və öz müstəqilliyi, dövlətçiliyi uğrunda apardığı mübarizəni daha əzmlə, daha qətiyyətlə davam etdirdi. Azərbaycan inkişaf etdi, gücləndi, bütün dünyada layiqincə tanındı. İnanırıq ki, ölkə rəhbərliyinin həyata keçirdiyi məqsədyönlü siyasət nəticəsində işğal olunmuş torpaqlarmız azad ediləcək.









Türk Tələbələrin İdarə Heyətinin sədri Hakan Köse çıxışında bildirib ki, Azərbaycan və Türkiyə qardaş ölkələrdir. Bizim ortaq tariximiz, dilimiz, dinimiz, mədəniyyətimiz var. Böyük Türk gəncliyi xalq və Vətən uğrunda mübarizəyə həmişə hazırdır. Azərbaycan Türk gəncliyinin ürəyində bir şah damardır.

Tədbirdə Xocalı faciəsi ilə bağlı videoçarx təqdim edilib.

Riyaziyyat və informatika fakültəsinin III tədris ili tələbəsi Ayşən Əsədova"Ya Qarabağ, ya ölüm!" şerini, həmin fakültənin II tədris ili tələbəsi Aytən Əsgərova "Qara dastan" şerini səsləndiriblər. Nadya Rzayeva "Qum sənəti" ni nümayiş etdirb, Azər Səlimov Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin III tədris ili tələbəsi Elşən Abbaszadənin tarda müşayiəti ilə "Qarabağ ağısı"nı səsləndirib.

**Nurlan Səmədov**

# Professor Həsən Mirzəyevin xatirəsinə həsr olunmuş tədbir

Fevralın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Müasir Azərbaycan dili kafedrasının yaradıcısı və ilk kafedra müdiri olmuş filologiya elmləri doktoru, professor, dilçi-türkoloq Həsən Mirzəyevin xatirəsinə həsr olunmuş tədbir keçirilib. Tədbir iştirakçıları öncə professor Həsən Mirzəyevin Fəxri Xiyabanda məzarını ziyarət edərək önünə gül dəstələri qoyublar, xatirəsinə ehtiramlarını ifadə ediblər.



Tədbiri giriş sözü ilə açan Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova professor Həsən Mirzəyevin həyat və fəaliyyəti haqqında məlumat verərək bildirib ki, Həsən Mirzəyev 1927-ci il noyabr aygngn 26-da mahalındakı Qovuşuq kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra 1948-1950-ci illərdə Naxçıvan Dövlət Müəllimlər İnstitutunda, 1951-1955-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) ali təhsil alıb. H.Mirzəyev əmək fəaliyyətinə 1950-ci ildə doğma kəndində orta məktəb müəllimi kimi başlayıb. 1955-ci ildə ali təhsilini başa vurduqdan sonra rayon xalq maarif şöbəsinin inspektoru və Qovuşuq kənd orta məktəbinin müəllimi, 1957-1959-cu illərdə isə məktəb direktoru işləyib. H.Mirzəyev 1959-1962-ci illərdə ADPU-da "Azərbaycan dilçiliyi" ixtisası üzrə aspiranturada təhsil alıb. Aspiranturanı bitirdikdən sonra ömrünün sonunadək ADPU-da işləyib. O, müxtəlif illərdə müəllim, baş müəllim, dosent, professor, kafedra müdiri və dekan müavini vəzifələrində çalışıb. H.Mirzəyev 1965-ci ildə namizədlik, 1988-ci ildə doktorluq dissertasiyalarını müdafiə edib. 1990-cı ildə professor elmi adını alıb.

Azərbaycan filologiya elminin inkişafında H.Mirzəyevin özünəməxsus xidmətləri var. O, dilçiliyin müxtəlif problemlərinə dair bir sıra sanballı tədqiqatları ilə tanınırdı. Alimin xüsusən Qərbi Azərbaycanın yer adları ilə bağlı araşdırmaları milli tariximizin öyrənilməsi baxımından xüsusi əhəmiyyət kəsb edir. H.Mirzəyevin 200-dən çox elmi əsəri, o cümlədən 25 kitabı və 10-a yaxın dərs vəsaiti işıq üzü görüb. Eyni zamanda bədii yaradıcılıqla da məşğul olub. Türk Dünyası Araşdırmaları Uluslararası Elmlər Akademiyasının akademik üzvü, Avropa Akademiyasının həqiqi üzvü, Azərbaycan Aşıqlar Birliyinin üzvü olub.

H.Mirzəyev böyük alim olmaqla yanaşı, həm də tanınmış ictimai-siyasi xadim idi. O, Azərbaycan Respublikası Milli Məclisinin I çağırışında 22 saylı Binəqədi ikinci seçki dairəsindən deputat seçilib. H.Mirzəyev 2002-ci ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Fərmanı ilə "Şöhrət" ordeninə, 2007-ci ildə isə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə "Əməkdar elm xadimi" fəxri adına layiq görülüb. Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü idi.

H.Mirzəyev 25 fevral 2015 -ci ildə Bakı şəhərində vəfat edib. Fəxri Xiyabanda dəfn edilib.

Tədbirdə çıxış edən Müasir Azərbaycan dili kafedrasının müdiri, professor Buludxan Xəlilov, həmin kafedranın professoru Mirvari İsmayılova, dosent Könül Səmədova, dosent Yeganə Qəhrəmanova, Türk araşdırmaları elmi-tədqiqat laboratoriyasının elmi rəhbəri, professor Elman Quliyev H.Mirzəyevin keçdiyi həyat yolundan, elmi yaradıcılığından, pedaqoji və ictimai fəaliyyətindən danışıblar.

Sonda xatirə şəkli çəkdirilib.

**Mənsur Qüdrətoğlu**

# 14 Fevral - Beynəlxalq Kitab Bağışlama Günü münasibətilə tədbir

Fevralın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzinin təşəbbüsü və təşkilatçılığı ilə ADPU-nun baza məktəbi olan Bakı şəhəri, Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbdə 14 Fevral- Beynəlxalq Kitab Bağışlama Günü münasibətilə tədbir keçirilib. Tədbirdə Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşları, tanınmış uşaq yazıçısı, Filologiya fakültəsinin və onun tədrisi metodikası kafedrasının professoru Zahid Xəlil, uşaq ədəbiyyatı tənqidçisi, həmin kafedranın professoru Füzuli Əsgərli, Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin direktoru Könül Həsənova, müəllim və şagirdlər iştirak ediblər.



Tədbiri giriş sözü ilə açan Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin direktoru Könül Həsənova tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə, həmçinin Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarına təşəkkür edib və gənclərin kitaba, ədəbiyyata, mütaliəyə marağının artmasına müsbət təsir edən belə tədbirlərin mühüm əhəmiyyət kəsb etdiyini vurğulayıb.



Kitabxana-İnformasiya Mərkəzinin direktoru vəzifəsini icra edən Zinharə Həsənova çıxış edərək ADPU-nun rəhbərliyinin təbrikini iştirakçılara çatdırıb. Z.Həsənova tədbirin təşkil edilməsinə verdiyi dəstəyə görə Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin direktoru Könül Həsənovaya təşəkkür edib. 14 Fevral- Beynəlxalq Kitab Bağışlama Gününün yaranma tarixi haqqında danışan Z. Həsənova bildirib ki, bu, təqvim ən yeni təqvimlərdən biridir. Belə ki, bu təqvim 2012-ci ildə yaranıb və ABŞ-da məşhur uşaq kitab saytının yaradıcısı Emmi Brodmorun adı ilə bağlıdır. Bu ideyanı ona balaca oğlu verib. 2013-cü ildən bu günü bir çox ölkələr qeyd etməyə başlayıblar. Həmin vaxtdan bu təşəbbüs bütün dünyada dəstək qazanıb və yenə də geniş dəstək alır. Bu əlamətdar günün yayılmasında məşhur müəlliflərin, bloggerlərin və uşaq yazıçılarının dəstəyi mühüm rol oynayıb. 14 Fevral- Beynəlxalq Kitab Bağışlama Günü son illər ölkəmizdə də qeyd olunur. Bu isə uşaqlarda kitaba sevgi, böyüklərdə isə bağışlamaq, hədiyyə etmək sevinci yaradır.

Professor Z.Xəlil, professor F.Əsgərli çıxış edərək tədbirin gənc nəslin mütaliə mədəniyyətinin formalaşmasında mühüm əhəmiyyət kəsb etdiyini bildiriblər.

Məktəbin şagirdlərinin səsləndirdikləri şeirlər tədbirə xüsusi ovqat qatıb.

Sonda müəllimlərə və şagirdlərə kitablar hədiyyə edilib.

**Mahirə Mustafayeva**

# İbtidai təhsil fakültəsində professor Seyidağa Həmidovun xatirəsinə həsr olunmuş tədbir

**Fevralın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində tanınmış metodist-alim, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar müəllim Seyidağa Sail oğlu Həmidovun xatirəsinə həsr olunmuş tədbir keçirilib. Tədbir iştirakçıları əvvəlcə foyedə Seyidağa müəllimə həsr olunan sərgi ilə tanış olublar.**



Tədbir iştirakçılarını salamlayan fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov bir əsrlik ənənəsi olan ADPU-da son illərdəki keyfiyyət dəyişikliyindən, rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə həyata keçirilən islahatlardan danışıb. Sonra "Professor Seyidağa Həmidovun həyatı və elmi-metodiki yaradıcılığı" mövzusunda məruzə edib, müəllimi ilə bağlı xatirələrini bölüşüb. Qeyd edib ki, ADPU burada pedaqoji və elmi-pedaqoji fəaliyyət göstərən ziyalılarımızın zəkası, nuru, işığı ilə müqəddəs məbədə çevrilib. Ömrünü millətin təhsili, maarifi və maarifçiliyi yolunda şam tək əridən belə müdrik insanlardan biri də dəyərli əməlləri, xeyirxahlığı, səmimiliyi, nəcib insani keyfiyyətləri ilə 18 yanvar 2018-ci ildə insanların yaddaşına köçən, xatirələrə çevrilən pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar müəllim Seyidağa Həmidovdur. O, 1938-ci ildə Lənkəran rayonunun Boladi kəndində anadan olub. 1960-cı ildə ADPU-nun Fizika-riyaziyyat fakültəsini bitirib. Bir müddət Bakının Qaradağ rayonunda müəllim işləyib. 1966-cı ildə müsabiqə yolu ilə ADPU-nun Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasında müəllim vəzifəsini tutub. 1972-ci ildə namizədlik, 1992-ci ildə doktorluq dissertasiyası müdafiə edib. Pedaqogika üzrə elmlər doktoru elmi dərəcəsinə, professor elmi adına layiq görülüb. 1994-2018-ci illərdə Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının müdiri olub. Onun rəhbərliyi ilə 13 nəfər gənc namizədlik dissertasiyası müdafiə edib. O, Pedaqoji fakültənin həmkarlar təşkilatının sədri, ilk partiya təşkilatının katibi, universitet Elmi Şurasının elmi katibi, Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının Ekspert Şurasının elmi katibi vəzifəsində çalışıb. 1973-2018-ci illərdə ADPU-da fəaliyyət göstərən Müdafiə Şurasının üzvü olub. 2006-cı ildə Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə "Əməkdar müəllim" fəxri adına layiq görülüb. "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı ilə təltif olunub. Onlarla dərslik və dərs vəsaitinin, elmi-metodik tövsiyənin və məqalələrin müəllifidir.

Tədbirdə çıxış edən ADPU-nun Ağsaqqallar Şurasının sədri, professor Malik Cəbrayılov, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çarırışaqədərki hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova, Riyaziyyat və onun ibtidai kursunun tədris metodikası kafedrasının dosentləri Zahir Kazımov, Quləməli Balaşov, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Şahrza Ağayev 80 il mənalı, şərəfli, ləyaqətli müəllim və alim ömrü yaşayan Seyidağa müəllimlə bağlı xatirələrini bölüşüb, onu tanınmış metodist-alim, bacarıqlı kafedra müdiri, dostluqda sədaqətli, sözündə bütöv, yüksək əxlaq və fəzilət sahibi kimi səciyyələndiriblər. Seyidağa müəllimin tələbəsi Tükəzban Cahangirova müəlliminə həsr etdiyi şeirini oxuyub.

Tədbirdə İbtidai təhsil fakültəsinin əməkdaşları, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmər doktoru Şəhla Əliyeva, Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova, Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zenfira Abdullayeva və nəvəsi, İqtisad Universitetinin II tədris ili tələbəsi Hikmət iştirak ediblər.

Tədbirin sonunda ailə adından oğlu, Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti Səid Həmidov çıxış edərək atası ilə bağlı xatirələrini bölüşüb, tədbirin təşkilatçılarına, iştirakçılarına və ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirib.

# Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası

Fevralın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Fakültənin dekanı, Elmi Şuranın sədri, dosent Elnarə Mehbalıyeva 2018-2019-cu tədris ilinin payız semestrinin müxtəlif tədris illəri üzrə "Kimya müəllimliyi", "Biologiya müəllimliyi", "Kimya və biologiya müəllimliyi" ixtisasları üzrə təhsil alan tələbələrinin imtahan sessiyasının nəticələri, 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan nəticələrinə əsasən təqaüd alacaq tələbələr haqqında ətraflı məlumat verib.






"Biologiya müəllimliyi", "Kimya müəllimliyi", "Kimya və biologiya müəllimliyi" ixtisasları üzrə IV və V tədris ili tələbələrinin pedaqoji təcrübəsinə hazırlıq haqqında Biologiya və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Anaxanım Yusifovanın və Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının müdiri, kimya üzrə fəlsəfə doktoru Reyhan Ağayevanın məlumatları dinlənilib.

Sonra 2018-2019-cu tədris ilinin yaz semestrinə hazırlıqla bağlı Analitik və üzvi kimya kafedrasının müdiri, kimya üzrə elmlər doktoru Əli Zalov, İnsan və heyvan fiziologiyası kafedrasının müdiri, dosent Nizam Mehdizadə çıxış ediblər.

Elmi Şurada Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirovun STEM layihə ilə bağlı məlumatı geniş müzakirə olunub.

Metodiki təminat və akkreditasiya bölməsinin müdiri, pedaqogika üzrə fəlsəfə doktoru Leyla Əliyeva elektron jurnalda qiymətləndirmə haqqında məlumat verib.

Elmi katib, kimya üzrə fəlsəfə doktoru Gülnarə Babayeva cari məsələlərlə Elmi Şura üzvlərini tanış edib. 1 fənn proqramının, 3 dərs vəsaitinin müzakirə olunaraq nəşr olunması məqsədəmüvafiq hesab edilib. "Kimyanın tədrisi metodikası" ixtisası üzrə 1 dissertantın, "Üzvi kimya" ixtisası üzrə əyani təhsilalma forması üzrə 1 doktorantın dissertasiya mövzuları və elmi rəhbərləri, qiyabi təhsilalma forması üzrə 1 doktorantın dissertasiya mövzusunun dəyişdirilməsi müzakirə olunaraq qəbul edilib.

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Elmi Şurasının iclası



**Fevralın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Elmi Şurasının 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələrinə həsr olunmuş iclası keçirilib.**



Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin dekanı, Elmi Şuranın sədri, dosent Laçın Həsənova iclası açaraq dekan müavini, dosent Razim Məmmədovu Filologiya fakültəsinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri vəzifəsinə seçilməsi münasibətilə təbrik edib, ona elmi-pedaqoji fəaliyyətində yeni uğurlar arzulayıb. Dosent R.Məmmədov çıxış edərək göstərilən diqqətə görə təşəkkürünü bildirib.

Elmi Şuranın iclasında payız semestrinin imtahan sessiyasının nəticələri və qarşıda duran məsələlərin həlli barədə ətraflı müzakirələr aparılıb, dəyərli təkliflər irəli sürülüb.

# Fizika və texnologiya fakültəsində elmi seminar

Fevralın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Fizika və texnologiya fakültəsinin Fizikanın tədrisi metodikası kafedrasının dosenti Xəlil Padarovun "Ümumdünya cazibə qanununun elmi-metodik təhlili" mövzusunda elmi seminarı keçirilib. Seminarda fakültənin professor-müəllim heyəti, magistrantlar və tələbələr iştirak ediblər.




Dosent X. Padarov ümumdünya cazibə qanununun əhəmiyyətindən və onun fizika elminin inkişafında rolu haqqında geniş məlumat verib. Qeyd edib ki, bu qanunun tədrisində ən müasir təlim vasitələrindən istifadə etmək daha məqsədəuyğundur.

Çıxış edən fakültənin dekanı, dosent Arzu Daşdəmirov, professor Şükür Əlizadə və başqaları bu mövzunun tədrisində meydana çıxan çətinliklərin dərsin quruluş mərhələlərinə düzgün əməl edilməməsindən irəli gəldiyini söyləyiblər.

Dosent X.Padarovun elmi seminarı uğurla keçirməsi iştirakçılar tərəfindən təsdiqlənib.

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində Xocalı faciəsi anılıb

Fevralın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində Xocalı faciəsinin iyirmi yeddinci ildönümü ilə əlaqədar anım mərasimi keçirilib. Anım mərasimində fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, dekan müavini, dosent Allahyar İmanov, professor Ramiz Əliyev, professor Museyib İlyasov, dosent Nailə Hüseynova, baş müəllim Nigar Məmmədova və fakültənin tələbələri iştiak ediblər.



Öncə Xocalı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad olunub.

Tədbirdə giriş sözü ilə çıxış edən dekan Şəhla Əliyeva Xocalı faciəsinin insanlığa və bəşəriyyətə qarşı törədilən ən dəhşətli faciələrdən biri olduğunu vurğulayıb.

Dekan müavini Allahyar İmanovun məruzəsi mərasim iştirakçıları tərəfindən diqqətlə dinlənilib.

Fakültənin tələbəsi Nəzrin İbrahimova Xocalı faciəsinə həsr etdiyi şeirini oxuyub.

Sonda Xocalı faciəsindən bəhs edən videoçarx nümayiş etdirilib.

# ADPU-nun Şəki Filialında Xocalı soyqırımına həsr olunmuş elmi-nəzəri konfrans





Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında Xocalı soyqırımının 27-ci ildönümünə həsr olunmuş "Xocalı soyqırımı insanlıq tarixində qanlı ləkədir" mövzusunda elmi-nəzəri konfrans keçirilib.

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Rafiq Rasulov Xocalı qətliamının təkcə Azərbaycan türklərinə qarşı həyata keçirilmiş cinayət deyil, bütün bəşəriyyətə, bəşəri dəyərlərin alçaldılmasına, gözdən salınmasına yönəldilmiş bir soyqırımı aktı olduğunu vurğulayıb. Sonra Xocalı soyqırımı qurbanlarının və şəhidlərimizin ruhu bir dəqiqəlik sükutla yad edilib.

Konfransda Humanitar fənlər kafedrasının baş müəllimi Həbibulla Manaflı "Xocalı soyqırımı - insanlıq tarixinin qanlı ləkəsi" adlı məruzə ilə çıxış edib. Məruzə ətrafında Təbiət fənləri və onların tədrisi metodikası kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru, professor Firədun İbrahimov "Xocalı soyqırımı - erməni faşizminin fəsadları", Humanitar fənlər kafedrasının baş müəllimi Mirvari Eminova "Xocalı soyqırımı qurbanlarının xatirəsi uca tutulur",

"Tarix və coğrafiya müəllimliyi" ixtisasının III tədris ilinin tələbəsi Xanım Xəlilova "Xocalıya ədalət - Qarabağa azadlıq!", "Tarix və coğrafiya" müəllimliyi ixtisasının III tədris ilinin tələbəsi Hülya Qədirbəyova "Xocalı soyqırımı - unutmadıq, unutmarıq!" mövzularında çıxışlar ediblər. "Təhsildə sosial-psixoloji xidmət" ixtisasının II tədris ilinin tələbəsi Ayxan Sədullazadə Xalq şairi Qabilin "Ümid sənədir ancaq, Azərbaycan əsgəri!" şeirini söyləyib.

Konfransın sonunda Xocalı soyqırımı ilə bağlı videoçarx nümayiş etdirilib.

# Fizika, dialektika və simmetriya

Orta məktəbdə fizikanın tədrisinə başlayarkən ona belə tərif verilir: "Fizika təbiət haqqında elmdir". Yaxşı nəzər yetirdikdə hər şeyin - materiyanın və hərəkətin fizikanın əhatəsində olduğunu dərk etmək elə də çətin deyil.

Təbiətin zənginliyi heç kəsdə şübhə doğurmur. Elə buna görə də orta məktəbdə fizikanın dərindən öyrənilməsi tamamlana bilməz. Burada fundament polunu oynayan əsas anlayşılar, prinsiplər və qanunlar öyrədilir. Mühüm bir cəhəti nəzərə almaq lazımdır ki, bu elm sahəsinə maraq orta məktəbdən başlayır. Bu məsələnin həllinin yaxşı və pis olması orta məktəbin, fizika müəlliminin hazırlıq səviyyəsindən, pedaqoji ustalığından asılıdır.

Burada bir haşiyəyə çıxacağam. Bəzən eşidirəm: "Yüksək elmlidir, dərsi yaxşı deyə bilmir". Mən isə 50 ildən çox orta məktəbdə, texnikumda, televiziyada dərs aparmış müəllim kimi bu fikri təkzib edirəm, heç cür ola bilməz ki, bir hadisəni mükəmməl biləsən, ancaq onu müsahibinə çatdıra bilməyəsən. Bir çox hallarda orta məktəb şagirdləri öz müəllimlərinə oxşamağa çalışır, gələcəkdə onun kimi olmağa, peşə ixtisasını da buna uyğun seçirlər.

Bax, bu cəhət fizikaya marağı artırar. Şagird biləndə ki, Fizika təbiət haqqında elmdir, təbiətdən kənarda heç bir şeyi təsəvvür belə etmək olmur. Onun bu elm sahəsinə marağı artar. Bu vəzifənin müvəffəqiyyəti üçün müəllimin elmi hazırlığı yüksək, psixoloji və pedaqoji ustalığı mükəmməl olmalıdır. Şagird tələbkarlıqda bir qayğı da duyursa, o verilən tapşırığı yerinə yetirməyə məsuliyyətlə yanaşır.

Fizikada elmi anlayışlar, kəşflər, prinsiplər, qanunlar o qədər çoxdur ki, onlar haqqında məlumatı nəinki bir məqaləyə, heç yüzlərlə qalın həcmli kitaba yazıb başa çatdırmaq olmaz. Ona görə də seçmə yolu ilə bir-iki kəşf barədə yığcam məlumatı oxucuya çatdırmağı faydalı hesab etdik.



M.Faradey



X.Ersted

Əvvəlcə fizika və dialektika barədə.

Dialektikada inkişaf əksliklərin vəhdəti və mübarizəsinə nəzər yetirək.

Fizika baxımından "Atomun quruluşu" mövzusunu maraqlı bildik. Atom nüvəsində müsbət yüklü proton, ətrfında isə müəyyən radiuslu orbitdə hərəkət edən mənfi yüklü elektrondan ibarət olan dayanıqlı sistemdir.

Hesablamalarla müəyyən edilmişdir ki, atom sistemində Kulon qüvvəsi, qravitasiya qüvvəsindən 1039 dəfə böyükdür. Bəs necə olur ki, həm kütləcə elektrondan minlərlə dəfə çox olan nüvə Kulon qüvvəsi ilə elektronu öz üzərinə salmır.

Bu paradoksa səbəb nədir? Bax, bu sual alimləri belə qənaətə gəlməyə vadar etdi: Deməli, nüvə daxilində elə qüvvə mövcuddur ki, o yuxarıda qeyd etdiyimiz hadisəyə imkan vermir. Bax, nüvə qüvvəsi məsələsi belə aktual oldu. Buradaca qısa şəkildə simmetriyaya nəzər yetirək və onun elmi kəşf üçün nə dərəcədə əhəmiyyətli olduğunu ekskurs edək. Demokrit atom haqqında ilk fikri söyləyəndən sonra atom haqqında X əsrdə Ə.Bəhmənyiar özünün "At-təhsil" əsərinin üçüncü hissəsi - Mövcud olan şeylər ilə məlumat verir. Ancaq elmdə bu məsələ ingilis alimi Ernest Rezerfordun adı ilə bağlıdır. O, 1911-ci ildə Atomun planetar modelini vermişdir. Sonradan Bor və başqaları bir sıra əlavələr etsələr də, hazırda atomun planetar modeli Rezerfordun adına yazılmışdır.

A.Eynşteyn Tanrının hər şeyi cüt yaratdığı qənaətində idi. Bəs elektronun cütü haradadır? Proton onun cütü ola bilməz, çünki onun kütləsi elektronun kütləsindən çox-çox böyükdür. Bu problemin həllinə Çedvikin 1932-ci ildə neytronu kəşf etməsi kömək etdi.

Fəlsəfi qanuna görə, materiya hərəkətsiz mövcud ola bilməz. Ona görə də nüvədəki proton və neytron arasındakı əlaqə hər hansı zərrəcik tərəfindən onların hərəkətliliyini yaradır. Bu zərrəciyin axtarılması ilə başladı. 1934-cü ildə Dirak və İvanenko bu zərrəciyin nüvədə kütləsi elektronun kütləsinə, yükü isə müsbət olmaqla elektronun yükünə bərabər olan Pazitronu kəşf etdilər.

Belə cütlüyü 1821-ci ildə Tomas Zeebekin istiliyin birbaşa elektrik yaratması - termoelektrik effektini kəşf etməsi və 1834-cü ildə Jan Peltyenin elektrikin birbaşa istilik və soyuqluq yaratması - "Peltye effekti"ni kəşf etməsi ilə görmək olar.

Bir mühüm kəşfin barəsində də bu aspektdə oxucuya məlumat verməyi lazım bildim. Bu kəşfə qədər elektrikdən qalvanik elementlərdən istifadə edilirdi. 1820-ci ildə Danimarka fiziki Xristian Ersted cərəyan keçən naqilin ətrafında maqnit sahəsi yarandığını kəşf etdi.

Bu kəşf alimlər qarşısında belə bir sual qoydu: "əgər elektrik maqnit yarada bilirsə, maqnit də elektrik yarada bilərmi?".

Bu problem üzərində bir çox alimlər çalışmağa səy göstərdilər. Fransız fiziki Amper, alman alimi Kollodon, rus alimi Lens və ingilis alimi Maykl Faradey bu cərgədə idilər.

Bu kəşfin sahibi ingilis alimi M.Faradey oldu. Elm tarixində yazılanlara görə, Faradey bu məqsədlə cibində 11 il maqnit parçası gəzdirib. Həm də yazılır ki, o, çox inadkar alim olub. Tədqiqatda onunla köməkçi kimi işləyənlərdən biri soruşur: - "Ser, 100-cü təcrübə baş tutmasa, nə edəcəyik?" Faradey isə "101-cini qoyacayıq". Nəhayət, 1831-ci il avqust ayının 27-də onun bu tədqiqatı uğurla başa çatır, Faradey elektromaqnit induksiya hadisəsini kəşf edir.

Faradey elə bir ciddi təhsil görməmişdi. O, gəmilərin birində ocaqçı işlədiyi vaxtlarda Hemfri Devi kimya ilə maraqlananlara sistemli mühazirələr oxuyurdu. Mühazirələrin birində o, Faradeylə maraqlanır, məlum olur ki, Faradey adi ocaqçıdır. Bu vaxt Devi Faradeyi laboratoriyaya pereperator götürür. Faradey Devi olmayan vaxtlarda onun təcrübələrini təkrar edib öyrənir. Bir qədər sonra o elektroliz hadisəsini Deviyə nümayiş etdirir (1834). Bundan sonra o, Devinin laboratoriyasında elmi əməkdaş kimi çalışır.

Sonradan elmi ictimaiyyət Deviyə belə bir sual verir: "Sənin ən böyük kəşfin hansıdır?" Devi isə: "Mənim ən böyük kəşfim Faradeydir?" deyə cavab verir.

Bu yazıda bildirmək istəyirik ki, təbiətdə heç şey yenidən yaranmır, materiya, hərəkət yalnız bir şəkildən başqa şəklə çevrilir, təbiətdə kəşf edilməmiş çoxlu problemlər var. Alimin, tədqiqatçının fəaliyyəti həmin gizlində qalan materiyanın, hərəkətin üzə çıxarması ilə bağlıdır.

Alimlər, tədqiqatçılar çətin daşlı-kəsəkli yolları qət etməklə bizə elmi nəticələr bəxş edirlər.

Elə bu alimlərin fəaliyyətinin nəticəsidir ki, bəşəriyyəti bu gün elmin məhsuldar qüvvəyə çevrildiyini görür.

Nağıllarda sehrli çubuq, sehrli güzgü, sehrli xalça bu gün həqiqətdə radioya, televiziyaya, kompüterlərə, təyyarələrə, kosmik gəmilərə çevrilmişdir.

Şübhə yoxdur ki, elm gələcəkdə insanlara daha çox şey bəxş edəcəkdir.

Bunu gənc nəsil bilməli və elmə yiyələnməyə daha ciddi səy göstərməlidir. Məktəblərin vəzifəsi gəncləri bu istiqamətə yönəltməkdən ibarət olmalıdır.

*Yazının sonunu dahi*
*Nizaminin*
*Qüvvət elmdədir, başqa*
*cür heç kəs,*
*Heçə kəsə üstünlük*
*eyləyə bilməz*

beyti ilə bitiririk.

**Tacəddin Vahidov,**
**ADPU-nun dosenti**

# TƏNQİDİ REALİZMİN ESTETİKASINA REALİST ELMİ BAXIŞ

***Azərbaycan ədəbiyyatında "izm"lərin taleyi və konkret ədəbi material əsasında inkişaf dialektikası tam olaraq tədqiq edilib aydınlaşdırılmamışdır. Ən yaxşı halda "izm"lərin ədəbi cərəyan kimi formalaşmasından və əsas təmsilçilərinin mövqeyindən bəhs edilməklə kifayətlənilmişdir. Filologiya elmləri doktoru, professor Təyyar Salamoğlunun "Azərbaycan tənqidi realizminin estetikası" monoqrafik tədqiqatı ədəbiyyatımızın görkəmli simaları olan Cəlil Məmmədquluzadə və Mirzə Ələkbər Sabirin yaradıcılığı əsasında bu ədəbi cərəyanın inkişafı məsələlərinə müasir elmi baxışı əks etdirir. Müəllifin tənqidi realizmi şərh edərkən konkret ədəbi materialın daxili məntiqindən çıxış etməsi, ədəbiyyatın gedişindən söz açarkən isə problemə aid "izm"in mahiyyətini açan bədii yaradıcılıq prosesini izləməsi hər iki qütbün real mənzərəsinin canlandırılmasına imkan yaradır. Bu, yalnız o zaman uğurlu alına bilər ki, tədqiqatçının ədəbi materiala bələdliyi ilə onun nəzəri dünyagörüşü bir-birini tamamlaya bilsin. Fikrimizcə, Təyyar Salamoğlunun simasında həmin proses baş tutmuşdur.***

Professor Təyyar Salamoğlu böyük demokrat yazıçı Cəlil Məmmədquluzadənin və görkəmli satirik şair Mirzə Ələkbər Sabirin simasında tənqidi realizm estetikası və ədəbiyyat məsələlərini yenidən tədqiq edib, ümumiləşdirilmiş şəkildə təqdim etmişdir. Bu məqsədlə hər iki qüdrətli sənətkarın yaradıcılığı yeni elmi təfəkkür işığında təhlildən keçirilərək dəyərləndirilmişdir.

T.Salamoğlu, ilk növbədə, tənqidi realizm anlayışına sovet dövründə ideoloji cəhətdən yanaşılmaqla keçən əsrin əvvəllərinin ədəbiyyatına, xüsusən də haqqında söz açılmış Cəlil Məmmədquluzadə və Mirzə Ələkbər Sabirin yaradıcılığına süni şəkildə inkarçılıq və şişirtmə baxımından yanaşıldığını elmi cəhətdən əsaslandırmışdır. O, sovet hakimiyyəti illərində tənqidi realizmə sosialist realizmi yaradıcılıq metodunun gözü ilə baxılmasının ədəbiyyatşünaslıq elmində yaratdığı anormal təhlillərin mahiyyətini obyektiv şəkildə müəyyən etmişdir. Bütün bunları nəzərə almaqla T.Salamoğlu XX əsrin əvvəlləri Azərbaycan ədəbiyyatının yaradıcılarının yaradıcılığına "müstəqillik dövrünün elmi düşüncəsi ilə yanaşmağı" zəruri və aktual bir tələb kimi irəli sürmüşdür. Çünki: "Sovet rejiminin ideoloji prinsipləri ilə yüklənən ədəbiyyatşünaslığın özündən əvvəlki zamana - Azərbaycan xalqının keçib gəldiyi inkişaf yoluna, o cümlədən XIX əsrin sonu, XX əsrin əvvəllərinə münasibəti tendensiyalı olmuşdur. Çox vaxt keçib gəldiyi tarixi yolun uğurları yox, bu yolda müşahidə olunan qüsurlu hallar xalqın tarixi xarakterinin və taleyinin əsas cəhətləri kimi ümumiləşdirilmiş, həqiqətdə olduğundan qat-qat artıq şişirdilmişdir. Xalq kütləsinin savadsızlığı nadanlıq, cəhalət və avamlıq, dinə inam fanatizm kimi qələmə verilmiş, milli ictimai təfəkkürdə başlanan yeniləşmə hərəkatına, ...milli tərəqqi uğrunda mübarizə proseslərində əldə olunan uğurlu fəaliyyətə, ...son nəticədə Azərbaycan xalqının öz müstəqil dövlətini qurmağa nail olmasına bilərəkdən göz yumulmuş, inkarçı tendensiya ilə xalqın tarixi keçmişi aşağılanmışdır".




Fikrimizcə, elmi-ədəbi mühitdə bəzən Mirzə Cəlil Məmmədquluzadənin inkar olunmasının, molla nəsrəddinçiliyin yanlış yozulmasının əsas səbəblərindən biri də milli tənqidi realizmin mahiyyətinin düzgün başa düşülməməsi ilə əlaqədardır. Avropada və Rusiyada tənqidi realizm hərəkatının görkəmli simalarının mənsub olduqları xalqın vətəndaşlıq simvolu kimi qəbul olunması ilə müqayisədə bəzi müəlliflərin "onlar xalqımızı aşağılamış və təhqir etmişlər" - deyə ölkəmizdəki eyni cərəyanın nümayəndələrinə qarşı ittihamlar irəli sürmələrinin mahiyyətində həm də keçmiş sovet ədəbiyyatşünaslığının təqdim etdiyi yanlış təqdimatlar və təhlillər dayanır.

Təqdim olunan tədqiqatda Cəlil Məmmədquluzadənin tərcümeyi-halının və yaradıcılığının obyektiv dərk olunması və elmi cəhətdən düzgün şərh edilməsi üçün açar funksiyasını ifadə edə biləcək "qaranlıq dünya" anlayışının şərhinə müxtəlif yönlərdən işıq salınması nəticə etibarilə həm də Azərbaycan tənqidi realizminin özünəməxsus iç dünyasının aydın surətdə dərk olunmasına şərait yaradır. Sovet ədəbiyyatşünaslığının "patriarxal-feodal cəmiyyətinin cəhalət, mövhumat, nadanlıq və əsarət dünyası", yaxud "müqayisədə sovet cəmiyyətinin üstünlüklərini, ... işıqlı bir dünyanın qurulması haqqında həqiqətləri ictimai şüura yeritmək üçün əlverişli təbliğata imkan yaradan" mühüm bir vasitə kimi təqdim etdiyi "qaranlıq dünya"nın - "zülmət səltənəti" ideyasının fəlsəfi-ideoloji əsaslarının "aşağı təbəqələrin qaranlıqda qalmalarının səbəbkarı", yaxud da həmin "qaranlıqdan işığa can atanlara hər cür, hər növ mane olanların ümumiləşdirilmiş ifadəsi" kimi izah edilməsi yazıçının yaradıcılığını daha dərindən başa düşməyə şərait yaradır. Eyni zamanda, Cəlil Məmmədquluzadənin Məhəmmədhəsən əmi, Novruzəli və usta Zeynal kimi obrazlarının cahil, avam, zavallı, miskin surətlər - "qaranlıq dünyanın sakinləri" kimi təqdim olunmasında da qeyri-elmi münasibətin təzahürlərini görən Təyyar Salamoğlu bunu bədii obrazların təhlil edilməsi prosesində mədəni geriliklə mənəvi cəhətdən sadəlövhlüyün eyniləşdirilməsi ilə bağlı olduğunda görmüşdür. Sovet ədəbiyyatşünaslığının "kiçik adam" konsepsiyasının ideoloji reseptinin mahiyyətini açan Təyyar Salamoğlu bunun əksinə olaraq Novruzəlini "şərə müqavimət göstərmək düşüncəsinə", Məhəmmədhəsən əmini "saflığı, ...əliaçıqlığı, gözütoxluğu, insanlara hər vaxt yaxşılıq etmək istəyi"nə və "çarəsizliyi"nə görə səciyyələnən obrazlar kimi təqdim etməsi yeni ədəbiyyatşünaslıq təfəkkürünün ifadəsidir. Təyyar Salamoğlunun "Məhəmmədhəsən əmidə sosial həyatda baş verənlərə münasibət daxili etiraz şəklində, Zeynəbdə isə açıq etiraz şəklində təzahür edir" - mülahizəsi də bədii əsərin daxili məntiqindən çıxış etməklə müşahidə olunan obyektiv qənaətdir. Eyni zamanda, Təyyar müəllim "ədəbiyyatşünaslığın mövcud usta Zeynal məntiqi"ni qıraraq onların fanatik, sadəlövh, tənbəl deyil, gerçək inama malik insanlar olduğunu nəzərə çarpdırır.

Tənqidi realizmin estetik prinsipləri Təyyar Salamoğlu tərəfindən həm də Mirzə Ələkbər Sabirin yaradıcılığının ictimai idealları ilə əlaqəli şəkildə açılıb aydınlaşdırılır. Yaxşı cəhətdir ki, Təyyar Salamoğlu tənqidi realizmin estetikasından çıxış edərək Mirzə Ələkbər Sabir sənətinə qiymət vermir. Əksinə, onun tədqiqatında Cəlil Məmmədquluzadənin timsalında olduğu kimi, Mirzə Ələkbər Sabirin də yaradıcılıq dünyası əsasında tənqidi realizmin meyarları formalaşdırılır. Təyyar Salamoğlu Sabir realizminin tənqidi realizmlə maarifçi realizmin qovşağında olmasını satirik şairin əsərlərindən gətirdiyi dəlillərlə isbat edir. Həqiqətən də "baltanı dibindən vuran" tənqidi realist yazıçı Cəlil Məmmədquluzadədən fərqli olaraq, Mirzə Ələkbər Sabir maarifçi realizm ağırlıqlı tənqidi realistdir. Mirzə Ələkbər Sabirin "gizli imza" kimi qəbul etdiyi "Ağlar güləyən" ifadəsindəki ağlamaq maarifçi, gülmək isə tənqidi düşüncənin xüsusiyyətlərini özündə cəmləşdirir. Təyyar Salamoğlunun Sabir satirasına münasibətdə də bəzən "sovet düşüncə tərzindən çətinlik çəkməyimiz" haqqındakı tezislərini onun özünün bu zəngin bədii irsə yenidən dönüşü ifadə edən fərqli elmi baxışları tamamlayır. "Sabir satirasında yox, Sabir satirasına verilən təfsirdə XX əsr mühiti büsbütün avamlıq, cahillik, istismar və dərəbəylik mühiti kimi qələmə verilir, Sabir satirasında məhz bu qaranlıq dünyanın inkar və ifşasının önə çəkildiyi iddia olunurdu" - mülahizəsi və bu tipli digər mülahizələrində ədəbiyyatşünaslıqdakı bir çox fikirlərin real gerçəkliklə səsləşmədiyini göstərən tədqiqatçı şairin yaradıcılığının mahiyyətini ifadə edən məntiqlə onun yaşadığı cəmiyyətə baxışlarındakı həyatiliyi diqqət mərkəzinə çəkərək yazmışdır: "Sabirin açdığı dava bəyliyə, ağalığa, mülkədarlığa, kapitalistliyə, şahlığa, sultanlığa qarşı deyildi. Sabir hər bir təbəqə nümayəndəsinə konkret situasiyadakı konkret hərəkət və əməlinə görə qiymət verirdi. Sabir ictimai və milli şüur yoxsulluğuna qarşı mübarizə aparırdı".

Təyyar Salamoğlu "Sabir satirasında "ictimai yuxarılar"ın yerini və mövqeyini obyektiv elmi meyarlarla tədqiq edib dəyərləndirir. Sabirin xalqın ictimai aşağılar və yuxarılara bölünməsinin şairi olmayıb, bütövlükdə və tam halda xalqın taleyinin vətəndaş müdafiəçisi olduğu yeni elmi mövqedən şərh edilmişdir. Milli şüuru oyatmaq, vətəndaş birliyinə nail olmaq Sabirin sənət kredosu, sənət konsepsiyası idi; - fikiri də obyektiv elmi qənaətdir. "Sabirin tərbiyə məktəbində sinif və yaxud təbəqə, ayrı-seçkiliyi yox idi... Millətin taleyi ilə bağlı düşünməyə mane olan hər cür əxlaqi və mənəvi naqisliyə qarşı kəskin tənqidi münasibət Sabir satirasının həqiqi milli məzmununu yaradır" - kimi fikirlər də milli satirik şeirin nəhəng nümayəndəsinin bütöv və möhtəşəm obrazını yaradır.

Təyyar Salamoğlu Sabir satirasının inkar və təsdiq pafosunun mahiyyətini dərindən aydınlaşdırmışdır. Onun Sabirin satirasında inkar pafosu ilə təsdiq pafosunun bir-birini tamamlamasına dair baxışları elmi-nəzəri cəhətdən əsaslandırılmış qənaətlər olduğu üçün inandırıcı səslənir.

Əsərdə Mirzə Ələkbər Sabirin yaradıcılığına XX əsrin əvvəlləri Azərbaycan ədəbi tənqidinin münasibəti də analitik təhlil üsulu ilə araşdırılaraq dəyərləndirilmişdir. Təyyar Salamoğlunun mühacirət ədəbiyyatşünaslığının və çağdaş ədəbiyyatşünaslıq elminin Mirzə Ələkbər Sabir haqqındakı araşdırmalarına tənqidi realizminin problemləri müştəvisində baxması və obyektiv elmi nəticələr çıxarması nəticə etibarilə böyük satirikin ölməz sənətinin yenidən dərk və şərh olunmasına işıq salır.

Sabirşünaslığa dair mübahisələrində də Təyyar Salamoğlu haqlı olub-olmamasından asılı olmayaraq, öz mövqeyini əsaslandırmağa səy göstərmiş, Sabir satirasının bayrağını ucada saxlamağa çalışmışdır

Bütövlükdə Təyyar Salamoğlunun tədqiqatı Azərbaycan tənqidi realizminə müasir realist baxışları əks etdirir.

**İsa Həbibbəyli,**
**akademik**

# ADPU-nun Quba Filialında Xocalı soyqırımına həsr olunmuş anım mərasimi

Fevralın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında Xocalı soyqırımının iyirmi yeddinci ildönümünə həsr olunmuş anım mərasimi keçirilib. Anım mərasimində ADPU-nun Quba Filialının direktoru, professor Əli Allahverdiyev, Quba Rayon Gənclər və İdman İdarəsinin rəisi Mustafa Nöhbalayev, filialın Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru Qələmşah İdrisov, müəllim və tələbələr iştirak ediblər.






Tədbirdə ilk olaraq Xocalıda həlak olmuş soydaşlarımızın və Vətən uğrunda mübarizədə canlarından keçmiş şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Anım mərasimində çıxış edən filialın direktoru, professor Əli Allahverdiyev, Quba Rayon Gənclər və İdman İdarəsinin rəisi Mustafa Nöhbalayev, filialın Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva,Tələbə Gənclər Təşkilatının (TGT) fəal üzvü, filialın "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Ayşən Hüseynova Xocalı faciəsinin insanlığa və bəşəriyyətə qarşı törədilən ən dəhşətli faciələrdən biri olduğunu vurğulayıblar.

Sonda Xocalı faciəsi ilə bağlı videoçarx nümayiş etdirilib.

# ADPU-nun Ağcabədi Filialında pedaqoji təcrübə ilə əlaqədar konfrans

**Fevralın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Pedaqoji fakültənin müvafiq ixtisasları üzrə təhsil alan IV və V tədris ili tələbələrinin pedaqoji təcrübələrinin başlanması ilə əlaqədar konfrans keçirilib.**

Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva konfrans iştirakçılarını salamlayıb və bildirib ki, pedaqoji təcrübənin uğurla həyata keçirilməsi üçün lazımi işlər görülüb. Ağcabədi şəhər tam orta məktəblərindən Mirzə Fətəli Axundzadə adına 3nömrəli məktəb-lisey, C.İbrahimov adına 8 nömrəli tam orta məktəb və Ağcabədi şəhər 8 nömrəli körpələr evi-uşaq bağçası ilə müqavilələr imzalanıb. Hesab edirik ki, tələbələrimizin nəzəri biliklərini təcrübi fəaliyyətdə nümayiş etdirmələri üçün lazımi şərait yaradılıb.



Filialın Tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov, Tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov, Pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru, baş müəllim Əli Əliyev və pedaqoji təcrübə rəhbəri, baş müəllim Əzizağa Həziyev çıxış edərək pedaqoji təcrübənin keçirilməsi qaydaları, qarşıda duran vəzifə və öhdəliklər barədə ətraflı məlumat veriblər. Qeyd olunub ki, IV və V tədris ili tələbələrinin pedaqoji təcrübəsinin təşkili və keçirilməsi haqqında ADPU-nun 27.02.2018-ci il tarixli 3/184 nömrəli əmrinə əsasən ADPU-nun Ağcabədi Filialında 04.01.2019-cu il tarixli 02/02nömrəli əmr ilə komissiya yaradılıb.

Pedaqoji fakültənin dekanı Ə.Əliyev bakalavr səviyyəsi üzrə filialın pedaqoji təcrübə keçəcək tələbələrinin sayını açıqlayaraq bildirib ki, ayrı-ayrı ixtisaslar üzrə filialın cəmi 142 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. "Riyaziyyat və informatika müəllimliyi" ixtisası üzrə 19 nəfər, "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 37 nəfər, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisası üzrə 40 nəfər, "Tarix və coğrafiya müəllimliyi" ixtisası üzrə 24 nəfər, "Məktəbəqədər təlim və tərbiyə" ixtisası üzrə isə 22 nəfər tələbənin 2018-2019-cu tədris ilində pedaqoji təcrübə keçməsi nəzərdə tutulub.

Görüləcək işlər barədə metodist müəllimlərin təklifləri dinlənilib.

Sonda pedaqoji təcrübədə iştirak edəcək tələbələrə uğurlar və seçdikləri şərəfli peşə yolunda atdıqları ilk addımda müvəffəqiyyət arzu edilib.

# ADPU-nun Şamaxı Filialında Xocalı soyqırımının 27-ci ildönümünə həsr olunmuş silsilə tədbirlər

**Xocalı soyqırımının 27-ci ildönümünə həsr olunmuş tədbirlərin keçirilməsi ilə əlaqədar Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında Tədbirlər planı təsdiq edilmiş və həmin Tədbirlər planına uyğun olaraq silsilə tədbirlər keçirilmişdir.**

İlk olaraq filialın kitabxanasında soyqırımı dəhşətlərini əks etdirən guşə hazırlanmışdır.

Fevralın 24-də filialın Akt zalında "Xoca" filminin nümayişi oldu.

Fevralın 25-də filialın akt zalında "Xocalı soyqırımı bəşəri cinayətdir" adlı tədbir keçirildi. Tədbir Xocalı soyqırımı zamanı qətlə yetirilmiş həmvətənlərimizin və torpaqlarımızın azadlığı uğrunda canlarını fəda etmiş bütün şəhidlərimizin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı.




Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Tünzalə Yusifova çıxışında qeyd etdi ki, hər il faciənin ildönümü istər respublikamızda, istərsə də onun hüdudlarından kənarlarda geniş qeyd olunur, faciə qurbanlarının xatirəsi yad edilir, dünya ictimaiyyətinə ermənilərin əsl üzü göstərilir.

İctimai elmlər və xüsusi fənlər kafedrasının dosenti Mayıl Alıcanov öz çıxışında Xocalı soyqırımını yalnız Azərbaycan xalqına qarşı deyil, bütün bəşəriyyətə qarşı törədilmiş cinayət adlandırdı.

Tədbirin bədii hissəsində tələbələrin hazırladıqları Xocalı soyqırımına həsr olunmuş videoçarx və ədəbi-bədii kompozisiya bir daha tədbir iştirakçılarında soyqırımını törədən erməni vandallarına qarşı nifrət hissi oyatdı.

Fevralın 26-da filialda ilk dərs saatları Xocalı soyqırımının tarixi faktlarına həsr olundu. Həmin gün Şamaxı Rayon İcra Hakimiyyətinin (RİH) təşkilatçılığı ilə rayonun İncəsənət Təhsil Mərkəzində keçirilən tədbirdə filialın tələbələri nümayiş etdikləri şeir kompozisiyası və səhnəciklə bir daha soyqırımın acı həqiqətlərini tədbir iştirakçılarının nəzərinə çatdırdılar.

Qeyd edək ki, rayon tədbirindən öncə filialın rəhbərliyi başda olmaqla, professor-müəllim heyəti və tələbələri Şamaxı RİH-in və rayon ictimaiyyətinin nümayəndələri ilə birlikdə rayon mərkəzində yerləşən azərbaycanlıların soyqırımı qurbanlarının xatirəsinə ucaldılmış abidəni ziyarət etdilər, abidənin önünə qərənfillər düzdülər.

## Allah rəhmət etsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Maliyyə şöbəsinin baş mühasibi Mətanət Quliyevaya qardaşı **Vahid Ələkbərovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 815
Sayı: 1500
Çapa imzalanıb: 28.02.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.